UOT: 338.43

# QEYRİ-NEFT SEKTORUNUN İNKİŞAFINDA AQRAR SAHƏNİN HAZIRKI DURUMU VƏ İNKİŞAF İSTİQAMƏTLƏRİ

**V. E. ƏLİYEV, S. Y. KƏRİMLİ**
**AKTN KTİETİ**

*Məqalədə aqrar sahənin müasir vəziyyəti və onun bir daha inkişaf istiqamətləri araşdırılır. Son dövrlər əhalinin aqrar ərzaq məhsulları ilə təminat səviyyəsi öyrənilir.*

***Açar sözlər***: *aqrar sahə, istehsal, istehlak, idxal, ixrac, kənd təsərrüfatı*

1995-ci il fevral ayının 18-də Prezident Heydər Əliyevin fərmanı ilə təsdiq edilmiş "Aqrar islahatların əsasları haqqında" Azərbaycan Respublikasının 25 maddədən ibarət Qanunun aqrar sahədə islahatların sürətləndirilməsinə dair bəzi məsələlər haqqında Azərbaycan Respublikası Prezidentinin 22 mart 1999-cu il tarixli fərmanının, 2 mart 2001-ci il tarixli fərmanı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasının Ərzaq Təhlükəsizliyi Proqramı"nın və başqa 2004-cü ilə kimi 100-ə qədər dəyərli qanun və qərarlarının müddəaları isə silahlanmış aqrar sahə əməkçiləri keçmiş səriştəsiz rəhbərlər tərəfindən tam dağılmış kənd təsərrüfatının yenidən bərpa edib, onun dinamik inkişafına nail oldular. Onun davamcısı dünya şöhrətli Prezident İlham Əliyevin 11 fevral 2004-cü il tarixli 24 №-li fərman ilə təsdiq olunmuş "Azərbaycan Respublikası Regionlarının sosial iqtisadi inkişafı Dövlət Proqramı (2004-2008-ci illər)", 25 avqust 2008-ci il tarixli 3004 № sərəncamı ilə təsdiq olunmuş "2008-2015-ci illərdə Azərbaycan Respublikasında əhalinin ərzaq məhsulları ilə etibarlı təminatına dair Dövlət Proqramı", Azərbaycan Respublikası regionlarının 2014-2018-ci illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı"nın, 2008-2015-ci illərdə Azərbaycan Respublikasında yoxsulluğun azaldılması və davamlı inkişaf Dövlət Proqramının, "Azərbaycan 2020 gələcəyə baxış" inkişaf konsepsiyasının və s. müdrik qərar və sərəncamları nəticəsində aqrar sahənin müasir sürətli dinamik inkişafı əldə olunmuş və 16 aprel 2014-cü il tarixli "Aqrar sahədə idarəetmənin təkmilləşdirilməsi və institusional islahatların sürətləndirilməsi ilə bağlı tədbirlər haqqında Azərbaycan Respublika Prezidentinin Fərmanı, Respublika Prezidentinin 2016-ci il 6 dekabr tarixli Fərmanı ilə təsdiq edilmiş Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi"-nin bütün bunlarla yanaşı ölkə Prezidentinin 14 iyun 2016-cı ildə imzaladığı "Kənd təsərrüfatı Kooperasiyası haqqında Azərbaycan Respublikasının Qanunu" gələcək inkişaf üçün geniş işıqlı yol açmışdır. Hal-hazırda aqrar sahə sürətli inkişaf yolundadır.

Aqrar sahənin inkişafına yönəldilən investisiyaların həcmi sürətlə artmışdır. 2004-cü ildə kənd təsərrüfatının inkişafına yönəldilən 35 milyon manat investisiyanın miqdarı 2016-cı ilə qədər sürətlə artaraq 325,1 milyon manata və ya son 5 ilin orta məbləği 453,5 milyon manat təşkil etmişdir ki, bu da investisiya qoyuluşunun 13 dəfəyə qədər artıldığını göstərir. Həmin müddətdə ( 2004-2016-ci illər) kənd təsərrüfatı üzrə ümumi daxili məhsulun artımı da nəzərə çarpır ki, bu artım 359,5 % olmuşdur. Bu müddətdə kənd təsərrüfatına ümumi məhsulu 3,6 dəfə (bitkiçilikdə 2,9 dəfə, heyvandarlıqda isə 4,4 dəfə) artmışdır.

2004-2016-ci il müddətində kənd təsərrüfatının ümumi məhsulunun artımından 3 dəfə artıq olmuşdur. Belə tədbirlərin həyata keçirilməsi nəticəsində 2004-2016-cı illərdə dənli və dənli paxlalı bitkilərin əkin sahəsi 1,2 dəfə artaraq 814,9 min hektardan 997,5 min hektara çatdırılmışdır. Bununla əlaqəli olaraq hər hektardan taxıl istehsalı da artaraq 25,8 s/hek-dan 30 s/hek təşkil etmişdir və ya 16,3 % artmışdır. Nəticədə məhsul istehsalının həcmi artaraq 3 milyon tona çatmışdır.

Adambaşına taxıl istehsalının 2004-2016-ci illər 254 kq-dan 310kq-a çatdırılması yaxud 1,2 dəfə artmışdır. Taxıl istehsalı sahəsində olan inkişafın heyvandarlıq məhsulları istehsalının artırılmasını təşkil edən yem bazasının möhkəmləndirilməsinə də böyük təsiri olmuşdur.

Əhalinin ərzaq təminatında yerli istehsalın rolunun artırılması sahəsində əsas problemlərdən biri heyvandarlıq məhsullarının sürətli artımının təmin edilməsi olmuşdur. Əhalinin etibarlı ərzaq təminatının təşkilinin əsas sahələrindən biri də ət, süd, yumurta məhsullarının dinamik artımının əldə olunmasıdır. Əsaslı aqrar islahatların aparılması heyvandarlığın inkişafına yol açsa da hələlik sahənin inkişaf səviyyəsi onun əsas ərzaq məhsullarına olan tələbatın daxili istehsal hesabına ödənilməsi qabiliyyətini təmin edə

bilməmişdir. Onun üçün də daimi heyvandarlıq məhsulları istehsalının genişləndirilməsi aqrar sahənin prioritetləri sırasında olmuşdur. Heyvandarlıq sahəsində baş sayının dinamik artımına nail olunmuşdur. Yemə olan tələbatın ödənilməsi məqsədilə yay və qış otlaqlarının yaxşılaşdırılması vəzifələri irəli çəkilmiş və bu istiqamətdə iş aparılmağa başlanmışdır. Bitkiçilik sahəsində məhsul istehsalı üçün ayrılan əlavə köməklik yem bitkilərinə də şamil edilmişdir. Onunla əlaqədardır ki, yem bitkilərinin əkin sahəsi əhəmiyyətli dərəcədə genişlənmişdir. 2004-2016-ci illərdə yem bitkilərinin əkin sahəsi 206,3 min hektardan 394,1 min hektara çatdırılmışdır ki, bu da həmin sahənin 2 dəfəyə yaxın artmasını göstərir. Bu dövrlərdə yem bitkilərinin əkin sahəsi ümumi əkin sahəsində tutduğu yerlər 15,9-dan 24,2-ə çatdırılmışdır.

Heyvandalıq cins tərkibinin yaxşılaşdırılması məqsədilə süni mayalanmanın təşkili və genişləndirilməsi dövlət tərəfindən həyata keçirilir; dövlət vəsaiti hesabına xaricdən yüksək məhsuldarlığa malik olan cins mal-qara alınaraq kənd təsərrüfatı istehsalçılarına güzəştli qiymətlərlə və lizinq yolu ilə satılır; dövlət müasir heyvandarlıq komplekslərinin yaradılmasına güzəştli kreditlərin ayrılması vasitəsilə köməklik göstərir. Dövlətin belə tədbirləri nəticəsində heyvandarlıqda məhsuldarlıq yüksəldilmiş, əsas heyvandarlıq məhsullarının artımı əldə olunmuşdur. 2004-2016-ci illər ərzində ət istehsalı (kəsilmiş çəkidə) 1,54 dəfə yani 196,8-dən 302,2 min tona yüksəlib, süd istehsalı 1,66 dəfə yani 1213,7-dən 2009,9 min tona yüksəlib, yumurta istehsalı 2 dəfəyə qədər və ya 829,4-dən 1609,8 milyon ədədə yüksəlib, yun istehsalı 1,36 dəfə və ya 12,3-dən 16,7 min tona yüksəlib, barama istehsalı 7,1 dəfə yanı 0,1-dən 0,71 min tona, bal istehsalında 4,5 dəfə artım əldə edilmişdir.

Adambaşına məhsul istehsalı taxıl 254-dən 310 kq-a (122%), kartof 112-dən 94-kq (83,9%), tərəvəz-bostan məhsulları 172,3-dən 178,8 kq (103,2%), meyvə 51-dən 92 kq (180%), ət kəsilmiş çəkidə 24-dən 34 kq (129,2%), süd 147kq-dan 209 kq-a (142,2%), yumurta 100-dən 167 ədədə (167%), balıq 3,0 kq-dan 6,6 kq-a (220%) təşkil etmişdir. Kənd təsərrüfatının ümumi məhsulunun artımı əhali artımını əhəmiyyətli dərəcədə qabaqlamışdır. Orta illik əhali 2004-cü ildki 8398,2 min nəfərə qarşı 2016-cı ildə 9757,5 min nəfər olmaqla 16,2% artığı halda kənd təsərrüfatının ümumi məhsulu müvafiq qaydada 1572,7-dən 5632,4 milyon manata çataraq 58,1 % yüksəlişə nail olmuşdur.

Aparılan tədqiqatdan məlum olur ki, kənd təsərrüfatında tarlaçılıq məhsulları ilə paralel olaraq heyvandarlıq məhsulları da müvafiq qaydada dinamik artım əldə olunsada yumurta istehsalı daha üstün olmuşdur.

Aqrar sahədə bazarın tələbi sayəsində kənd təsərrüfatının ümumi məhsulunun strukturunda heyvandarlıq məhsullarının xüsusi çəkisi 2004-2016-cı illər ərzində 9,8% artımla 44,4%-dən 54,2%-ə yüksələrək bitkiçilik sahəsinin 8,5% artımla üstələmişdir.

Aqrar sahədə göstərilən struktur dəyişiklikləri ölkədə ərzaq məhsullarına olan daxili tələbatın ödənilməsinin tələbi əsasında yaranmışdır. Araşdırmalar göstərir ki, həyata keçirilən kompleks tədbirlər sayəsində əsas iqtisadi problem olan əhalinin etibarlı ərzaq təminatı sahəsində əhəmiyyətli irəliləyişlərə nail olunmuşdur. Bu sahədə olan irəliləyişlər hələlik qarşıda duran problemin həllini yəni əsas ərzaq lakin hələlik ərzaq məhsulları ilə daxili istehsal hesabına tam özünütəmin etməyə nail olunmuşdur. Ölkəmiz əhalinin ərzaqla təmin olunması üçün valyuta ilə xaricdən 24,4 min ton quş əti, 14,3 min ton kərə yağı və digər, 46132,9 milyon ədəd yumurta, 183,0 min ton kartof, 12,6 min ton çay, 1600 min ton buğda, 48,2 min ton düyü, 3,7 min ton buğda unu, 138,4 min ton bitki yağı, 15,3 min ton marqarin, 1,9 min ton ət kolbasası, 4,6 min ton ət və balıq konservləri, 8,7 min ton makaron məmulatları və s. idxal hesabına əldə etməyə məruz qalmışdır. Bununla belə hələ fizioloji norma tələbində ərzaq təminatı yarada bilməmişik. Aydın olur ki, prioritet istiqamətlər üzrə təmin olunan artım miqyasları bütün hallarda müvafiq məhsullara əhalinin dinamik olaraq yüksələn tələblərinə uyğun gəlmir.

Ərzaq təhlükəsizliyinə nail olunmaq üçün kifayət qədər yüksək göstəricilərə bir sıra məhsul növlərinin istehsalında zəruri stabilliyin təmin edilməsi özünütəminetmə səviyyəsinə çıxmağa imkan vermir. Həmin sahələrdə artımın stabilləşməsi və dövlətin siyasəti çərçivəsində müəyyən edilmiş strateji hədəflərə çatmağın zəruri şərtinə çevrilir. 2004-2016-cı illər ərzində ərzaq mənşəli kənd təsərrüfatı məhsullarının emalından əldə olunan və eləcədə kənd təsərrüfatı məhsullarının ixracının artması aqrar sahənin inkişafda olduğunu şərtləndirir. Göstərilən sahələr üzrə ixracın məbləği 2004-cü ildə 127,8 milyon ABŞ dolları olmuşdursada bu göstərici 2016-ci ildə 488,8 milyon dollar təşkil edərək 3,8 dəfədən çox artım əldə edilmişdir. Buradan belə nəticəyə gəlmək olar ki, aqrar sahənin inkişafında kənd təsərrüfatının qlobal iqtisadiyyata inteqrasiyasında irəliləyiş vardır.

Həmin dövrdə, ixracın ümumi surəti artığı vaxt ayrı-ayrı məhsulların ixracının dinamikasında fərqli göstəricilər nəzəri cəlb edir. Belə ki, ərzaq mənşəli məhsulların, o cümlədən kartofun , tərəvəzin, meyvənin ixracı çoxaldığı halda üzüm, pambıq, barama və tütün məhsullarının ixracı dəfələrlə aşağı düşmüş, aqrar ixracatda bunların payı minimuma enmişdir. Baxmayaraq ki, həmin məhsullar əvvəlki dövrlərdə aqrar ixracatdan gələn valyuta gəlirinin əsas hissəsini tuturdu.

Dövlət başçısı Azərbaycanda pambıqçılığın, taxılçılığın, baramaçılığın, üzümçülüyün, çayçılığın, tütünçülüyünün və şəkər çuğundurunun istehsalının genişləndirilməsinin əhəmiyyətindən danışarkən bunun

əhalinin məşğulluğunun təmin edilməsinə, daxili bazarda bolluğun yaranmasına və ölkəmizin ixrac imkanlarının artırılmasında mühüm əhəmiyyət verəcəyinə əminliyini ifadə etmişdir. Bununla paralel olaraq heyvandarlığın inkişafı ilə bağlı qarşıya qoyulan vəzifələrin icrası ölkənin ərzaq təhlükəsizliyinin təminatı, daxili bazarın idxaldan asılılığının azalmasında mühüm əhəmiyyət kəsb edir.

Azərbaycanın indiki dövrdə kənd təsərrüfatının inkişafı üçün ekstensiv və intensiv amillərin çulğaşması səciyyəvidir. İstehsala cəlb olunan əkin sahələri, habelə kənd təsərrüfatı sahəsində məşğul olan işçilərin sayının artması həm də məhsuldarlıq göstəricilərinin yüksəlməsi ilə müşayət olunur. 2004-cü ildə kənd təsərrüfatı, ovçuluq və meşəçilik sahəsində çalışan işçilərin sayı 1502,7 min nəfər olmuşdur. Bu göstərici 2016-cı ildə 1729 min təşkil edərək 15 % artmışdır. Həmin dövrdə dənli taxılın məhsuldarlığı 26,5 s/h-dan yüksələrək 2016-cı ildə 31,3 s/ha olmaqla 18 faiz artmışdır, müvafiq olaraq kartof 137-dən 140-a 2 %, tərəvəz 135-dən 159-a 17,8 %, bostan bitkiləri 116-dan 176-ya 51,7%, şəkər çuğunduru 178-dən 490-a 75,3%, dən üçün günəbaxan 12,8-dən 20,8-ə 62,5%, meyvə 51,4-dən 65,7-yə 28,8%, üzum 38,9-dan 84,4-ə 2,2 dəfə, çay 2,9-dan 14,1-ə 4,9 dəfə, pambıq 17,4-dən 18-ə 3 %, tütün isə azalmışdır 24,6-dan 15,2 yenmişdirsədə bu göstərici 2011-ci ildən 2015-ci illər arası ardıcıl olaraq artıb orta hesabla 26,5 s/h təşkil etmişdir ki, bu hesabla 7,7 % artım təşkil etmişdir. Tarlaçılıqla yanaşı heyvandarlıq sahəsində bir baş inəkdən alınan süd 1105 kq-dan 1513kq-a 39,2%, bir toyuqdan yumurta 198 ədəddən 194 ədədə düşərək 2% azalmışdır, bir baş qoyundan yun qırxımı 1,8kq-dan 2,1kq-a qalxaraq 16,7% artmışdır.

Qeyd edilən istiqamətdə bütövlükdə intensiv amillərin fəallaşması müşahidə edilir. 2004-2016-cı illərdə taxıl əkin sahəsi 814,9 min hektardan 997 min hektara çatdırılaraq 22 % artırılmış onunla yanaşı taxılın hektardan məhsuldarlığı və məhsul istehsalı artaraq 2158,2 dən 3065,1 min tona yüksələrək 42 % artmış, kartofun əkin sahəsi və məhsul istehsalı hər ikisi azalmışdır. Əkin sahəsi 65,8 min hektardan 62,8 min hektara düşərək 4,8 %, istehsal isə 930,4 min tondan 902 min tona yenərək 3,1 % azalmışdır. Ancaq məhsul istehsalın azalma tempi sahənin azalma tempindən 1,7 % az olmuşdur. Tərəvəzin əkin sahəsi 77,9 min hektardan 73,7 min hektara azaldığı halda (5,4 %), məhsul istehsalı 1076,2-dən 1270,1 min tona çataraq 18 % artıma nail olmuşdur. Bostan məhsuları istehsalı sahəsində intensiv amillər daha aydın nəzərə çarpır əkin sahəsi 30,5 min hektardan 26,4 min hektara 13,5 azaldığı halda, məhsul istehsalı 355,3-dən 464,8 min tona yəni 109,5 min ton və ya 13,5% artıma nail olmuşdur. Meyvə və üzüm istehsalı sahəsində əkin sahəsi və məhsul istehsalı paralel olaraq artsa da istehsalın artımı əkin sahəsinin artımından daha çox yəni meyvəçilikdə əkin sahəsi 82,5 min hektardan 133,1 min hektara çatdırılaraq 61,3 % artım əldə olunduğu halda məhsul istehsalı 424,6 min tondan 882,8 min tona çatdırılaraq 208 % artımla sahə artımını 46,7 % üstələmişdir. Üzümçülükdə də eyni qaydada sahə 7,3 min hektardan 13,9 min hektarı yəni 90,4 % artırılmış, məhsul isə 54,9 min tondan 136,5 min tona çatdırılmaqla 248 % artım əldə edilmişdir ki, bu da sahə artımından məhsul istehsalı artımının 58,6 % çox olduğu aydınlaşır. Şəkər çuğunduru əkininin 2 dəfədən çox yəni 2004-cü ildəki 3,2 min hektardan 2016-cı ildə 7,1 min hektara çatdırılaraq münasib olaraq 568 min ton məhsul istehsalına qarşı 312,6 min ton məhsul toplanmışdır (5,5 dəfə artımla). Eyni qayda üzrə dən üçün günəbaxan sahəsi 11,3-dən 8,2-yə düşsədə məhsul istehsalı məhsuldarlığın artımı hesabına 14,3 min tona qarşı 16,7 min ton təşkil etmişdir ki, bu da əkin sahəsində 27 % azalma olduğu halda, məhsul istehsalının 16,8% artdığını göstərir.

Çayçılıq sahəsində də son illər irəliləyişlər nəzərə çarpır. Texniki bitkilərdən pambıq və tütünün istər əkin sahəsi və istərsədə məhsul istehsalı kəskin azalmışdır. Pambıq əkin sahəsi üzrə 34,3 % məhsul istehsalı sahəsində 34,1 % geriləmişdir. Buna baxmayaraq hər iki sahədə son illər irəliləyişlər görünür. 2010-cu illə müqayisədə pambıq məhsulu 38,2-dən 89,4 min tona (2,3 dəfə) artırılmışdır. Tütün də eyni qayda üzrə 3,2-dən 3,6-ya çatdırılaraq 12,5 % artmışdır.

Bitkiçiliklə yanaşı heyvandarlıq sahələri üzrə də intensiv inkişafın olduğu görünür. İribuynuzli malqaranın baş sayı 2004-2016-cı illər ərzində 2241 min başdan 2698,5 min başa çatdırılaraq 20,4 % artdığı halda, süd istehsalı 1188,6 min tondan 1683,4 min tona çataraq 41,6 % artmışdır. Ət istehsalı da eyni qayda üzrə mal əti 94,6 min tondan 119,6 min tona çataraq 26,4 % artıma nail olunmuşdur. Qoyun və keçilərin artımı həmin dövrdə 7280,1 min başdan 8614,8 min başa çatdırılaraq 18 %, ət istehsalı isə 55,7 min tondan 75,2 min tona (yəni 35% artımla) çatdırılmışdır. Belə ki, məhsul istehsalının artım faizi baş sayı artım faizini 2 dəfəyə yaxın üstələmişdir. Quşçuluq sahəsində baş sayı və ət istehsalı demək olaraq paralel artaraq baş sayı 59,6%, ət istehsalı isə 2,2 dəfə yüksəlmişdir. Arı ailələri 84 mindən 26,1 minə çataraq 3,1 dəfə artım əldə etmişdir və eləcə də bal istehsalı da 0,6 min tondan 2,7 min tona yəni 4,5 dəfə artıma nail olmuşdur.

Bütün sahədə istehsalın həcmlərinin baş sayı və ya əkin sahələrinin qabaqlama əmsallarının yüksək olması modernləşmə amilin geniş yer aldığını göstərir.

Tədqiqat nəticəsində aydın olur ki, bir çox müvəffəqiyyətlərlə yanaşı əldə olunan məhsuldarlıq göstəriciləri ilə heç də razılaşmaq olmaz, bununla indiki qarşıda duran hədəfə çatmaq qeyri mümkündür.

Məhsul istehsalının artırılmasının əsasını təşkil edən üzvü gübrələrdən istifadə son dərəcə aşağıdır.

Kənd təsərrüfatının texniki təminat səviyyəsinin zəruri tələblərdən aşağı olması aradan qaldırılmaqdadır, texnika ilə təminatda komplektlik təmin olunmalıdır. Kənd təsərrüfatı maşınlarının ayrı-ayrı növləri ilə təchizatda geri qalmalar aradan qaldırılmaqdadır. 2005-ci illə müqayisədə 2016-ci ildə 100 traktora düşən kotanların sayı 70, kultivatorların sayı isə 93 olduğunu nəzərə alıb tədbirlər ələ alınmışdır. Bu çatışmamazlıqların kənd təsərrüfat işlərinin lazımı aqrotexniki müddətlərdə yerinə yetirilməsinə törətdiyi əngəllər ləğv edilməlidir. Bir çox kənd təsərrüfatı maşın və alətlərinin respublika daxilində istehsal olunmasına zərurət vardır.

Yuxarıda göstərilənləri nəzərə alaraq, ölkənin təhlükəsizliyi tam təmin etmək ərzaq məhsulları idxalını aradan qaldırmaq və aqrar ixracı genişləndirmək məqsədilə kənd təsərrüfatı məhsullarının davamlı inkişafını yaratmaqda Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 6 dekabr tarixli Fərmanı ilə təsdiq edilmiş Strateji Yol Xəritəsi böyük mayak olaraq əsas götürülməlidir. Bunun əsasında da başqa rəqabət qabiliyyətli təsərrüfat formaları ilə yanaşı yeni istehsal kooperativləridə yaradılmalıdır. 2025-ci ilə qədər ölkədə kooperativlər və müqavilə fermer birliyi sistemi yaradılacağı Strateji Yol Xəritəsində verilmişdir.

## ƏDƏBİYYAT

**1.** 2008-2015-ci illərdə Azərbaycan Respublikasında əhalinin ərzaq məhsuları ilə etibarlı təminatına dair Dövlət Proqramı. Bakı, 2008. 30s. **2**. İlham Əliyev Azərbaycan Respublikasının Prezidenti. Kənd təsərrüfatı Kooperasiyası haqqında Azərbaycan Respublikasının Qanunu. Bakı, 14 iyun 2016**.** **3**. Azərbaycan Kənd Təsərrüfatı Nazirliyi "Azərbaycan Respublikasında Aqrar Sənaye kompleksinin inkişafı strategiyası". **4.** Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsi "Azərbaycanın kənd təsərrüfatı" statistik məcmuə. Bakı 2017. **5**. Bəyali Ataşov. Aqrar sahədə struktur və səmərəlilik problemləri (nəzəriyyə və praktika) "Kooperasiya" nəşriyyatı. Bakı, 2017, 535s. **6**. Məmmədov Oqtay, İsmayılov Mürsəl, İsmayılov Fazil. Milli iqtisadiyyatın tənzimlənməsi. Dərslik Bakı, 2014, 624s.

### Состояние аграрного сектора в развитии не нефтяного сектора и направлениях развития

**В. А. Алиев, С. Ю. Керимли**

В статье рассматривается современное состояние аграрного сектора и его дальнейшие направления развития. В последнее время изучается уровень обеспечения населения аграрными продовольственными товарами.

***Ключевые слова:*** аграрный сектор, производство, потребление, импорт, экспорт, сельское хозяйство.

### The state of agrarian sector in development of non-oil sector and development directions

**V. E. Aliyev, S. V. Kazimli**

The article describes the current state of agrarian sector and its development trends. In recent years, the level of access to population for agricultural food products has been studied.

***Key words***: agriculture industry, production, consumption, import, export, agriculture.